# MÜSAHİBƏ




**Tarixdən danışarkən bir məsələni də qeyd edim ki, Nizami "Xəmsə"də Azərbaycanın qədim tarixinə dair mövzulara da geniş yer ayırır. Nüşabənin timsalında o, Qafqaz Albaniyasının dağlarında yaşayan və barələrində Strabon da daxil olmaq antik müəlliflərin də mövcudluqlarıdan danışdıqları amazonkaları, yəni qadın səltənətinin varlığından söz açır. Həmçinin, Nizami qədim Bərdədən geniş söz açır, rusların bu şəhərə dağıdıcı yürüşlərini xatırlayır, Gəncə zəlzələsindən bəhs edir. "Xəmsə"də 1139-cu ilin güclü Gəncə zəlzələsindən söz açılır və Gəncənin bu zəlzələdən sonra özünə gəldiyi haqqında məlumat verilir. Sual edirəm, Azərbaycanla bağlılığı olmayan, bu xalqın keçmişinə həssaslıq duymayan hər hansı fars, yaxud ərəb ədibi bunu bacararmı?**

**Sual:** Eldar müəllim, ilk növbədə jurnalımızın müsahibə təklifini qəbul etdiyiniz üçün sizə təşəkkürümüzü bildirir, böyük Azərbaycan şairi Nizami Gəncəvinin elmi dünyagörüşünə dair qələmə aldığınız və ictimaiyyət tərəfindən maraqla qarşılanmış yeni kitabınızın işıq üzü görməsi münasibətilə sizi təbrik edirik. Elm tarixi nöqteyi-nəzərindən Nizami irsi necə təsir bağışlayır?

**Cavab:** Müsahibə təklifiniz və mənim kitabıma göstərdiyiniz maraq üçün mən də öz növbəmdə sizə minnətdaram. İctimaiyyətin, xüsusilə də sadə oxucuların Nizami irsinə bu qədər həssaslıqla, maraqla yanaşması məni çox sevindirir. Bu fakt bir daha göstərir ki, Nizami Gəncəvi şəxsiyyəti və onun əsərləri bütün dövrlərdə olduğu kimi bu gün də hər bir azərbaycanlı üçün əzizdir.

Elm tarixi nöqteyi-nəzərindən isə Nizami kifayət qədər əzəmətli, eyni zamanda layiqli qiymətini almamış mütəfəkkir kimi görünür. "Xəmsə" Nizami irsini və Şərqin elmi düşüncə tarixini araşdırmış əksər yerli və əcnəbi tədqiqatçıların etiraflarına əsasən mübaliğəsiz olaraq öz dövrünün ensiklopediyası adlanmağa layiq dəyərli bir xəzinədir. "Xəmsə"də o dövrün siyasətdən tutmuş, astronomiya, fizika, tibb də daxil olmaqla bütün aparıcı elm sahələrinə dair orijinal və novatorçu yanaşmalara rast gəlmək mümkündür. Nizami qətiyyən sələflərini təqlid etmir və kiməsə bənzəməyə çalışmış. Onun öz əsaslandırılmış, tutarlı yanaşması var. Doğrudur, biz onun fikirlərində xüsusilə də dövlət idarəçiliyinə, fəlsəfəyə dair baxışlarında Şərqin Fərabi, İbn Sina, Biruni kimi dahilərinin təsirlərini müşahidə edirik və bu da tam təbiidir. Çünki, Nizami şərqli idi və İslam dünyasının bu nəhəng elm dühalarının baxışları Nizaminin bir şəxsiyyət, alim kimi formalaşmasına təsir göstərməyə bilməzdi. Nizami onların mütərəqqi təşəbbüslərini, ideyalarını dərindən əxz etmiş, onları öz müıahizələrilə zənginləşdirmiş və gələcək nəsillər üçün yeni çıxır açmışdır. Nizami şair olmasına baxmayaraq elmi şeiriyyətdən, alimi ədibdən üstün tutduğunu açıq şəkildə dilə gətirməkdən çəkinmir. Oğlu Məhəmmədə nəsihətində onu elmə meyl göstərməyə, onu şeir yox bilik dalınca getməyə təşviq edir.

"Xəmsə"yə daxil olan poemaların hər birində Nizami müxtəlif elm sahələrinə dair hərtərəfli biliyini nümayiş etdirmiş və nəticədə meydana intellektual ədəbiyyatın parlaq nümunəsinə çıxarmağa müvəffəq olmuşdur. Nizaminin mürəkkəb elmi fikirləri sadə üslubda, özü də şeir dililə ifadə etməsi isə onun fitri istedadından xəbər verir. Nəinki Şərq, hətta dünya ədəbi və elmi fikrinin

tarixində bunu bacaran şəxsiyyətlərin sayı barmaqla sayılacaq qədər azdır. Nizami elmi və mədəni irsin qiymətləndirilməsi məsələsində əsla millətçi, yaxud məzhəbçi mövqedən çıxış etmir. O müxtəlif mədəniyyətlərin, qədim dövrün elmi düşüncəsinin ən parlaq nümunələrini müasirliklə əlaqələndirir, onlardan bəhrələnməyə çalışır və keçmişin nailiyyətlərinə yüksək qiymət verməkdən çəkinmir. Bu və digər amillər Nizaminin ümumbəşəri dəyərini müəyyən edir, onun elmi fikirlərinin dərinliyini təmin edir. Məhz elə ona görə də üzərindən 9 əsrə yaxın vaxt keçməsinə baxmayaraq Nizaminin elmi dünyagörüşü tədqiqatçıları cəzb etməyi bacarır.

**Sual:** Eldar müəllim, Sizin kitabınızın bir fəsli də Nizami yaradıcılığında tarixilik mövzusuna həsr edilib. Siz bildirirsiniz ki, tarix Nizami üçün sadəcə hadisələrin kor-koranə, xaotik axını demək deyil. Cərəyan edən hadisələrin hamısı müəyyən qanunauyğunluqlarla tənzimlənir. Belə hesab etmək olarmı ki, Nizami əsərlərində tarixin fəlsəfəsi məsələsinə işarə vurur, bu mövzuya ümumi şəkildə giriş edir?

**Cavab:** Bəli, müəyyən mənada belə hesab etmək olar. Məsələn, o, dəfələrlə vurğulayırıq ki, istənilən hakimiyyətin uzunömürlülüyü və sabitliyini hökmdarla onun təbəələri arasındakı münasibətlərin səciyyəsindən birbaşa asılıdır. Əgər hökmdar yersiz qəddarlığa yol verir, təbəələrini yalnız qorxu yolu ilə idarə edir və talayırsa, o zaman hər hansı etimaddan söhbət gedə bilməz. Belə hökmdarın ilk ciddi təhdidlə məqamında hakimiyyətləri laxlayır və onlar əksər hallarda xəyanətlə üzləşirlər. İran şahı III Dara kimi. Nizami yazır ki, Dara müharibəni əslində Makedoniyalı İsgəndərlə döyüşdən çox əvvəl uduzmuşdu. Çünki, təbəələri fikrən ondan üz döndərmişdi və ondan yaxalarını qurtarmaq üçün fürsət gözləyirdilər. İsgəndərin hücumu isə bu mənada yalnız təkan rolunu oynamışdır.

Tarixdən danışarkən bir məsələni də qeyd edim ki, Nizami "Xəmsə"də Azərbaycanın qədim tarixinə dair mövzulara da geniş yer ayırır. Nüşabənin timsalında o, Qafqaz Albaniyasının dağlarında yaşayan və barələrində Strabon da daxil olmaq antik müəlliflərin də mövcudluqlarıdan danışdıqları amazonkaları, yəni qadın səltənətinin varlığından söz açır. Həmçinin, Nizami qədim Bərdədən geniş söz açır, rusların bu şəhərə dağıdıcı yürüşlərini xatırlayır, Gəncə zəlzələsindən bəhs edir. "Xəmsə"də 1139-cu ilin güclü Gəncə zəlzələsindən söz açılır və Gəncənin bu zəlzələdən sonra özünə gəldiyi haqqında məlimat verilir. Sual edirəm, Azərbaycanla bağlılığı olmayan, bu xalqın keçmişinə həssaslıq duymayan hər hansı fars, yaxud ərəb ədibi bunu bacararmı?

Nizami poemalarından görünən odur ki, müəllif tarixi məxəzlərin öyrənilməsinə böyük vaxt və güc sərf edib. O, özü də bunu gizlətmir və bildirir ki, Təbəri, Buxari kimi mənbələri, həmçinin bir çox qədim müəllifləri dərindən mütaliə edərək, onlardan bəhrələnmişdir. Həqiqətən də Nizami tarixi hadisələrdən danışarkən olduqca ehtiyatlı davranır, hadisələrin tarixi əsasını təhrif etməməyə çalışır. Doğrudur, Nizami həm də şairdir və onun təxəyyülü keçmiş hadisələrin təqdimatı üslubuna da təsirsiz ötüşməyib. Lakin istənilən halda Nizami tarixi obyektivliyə, səhihlik prinsipinə bacardığı qədər həssas yanaşmağa çalışıb. Bu faktdır.

Onu da qeyd etməliyəm ki, "Xəmsə" yalnız qədim tarixə dair deyil, Nizaminin yaşadığı dövr üçün də maraqlı mənbələrdən hesab oluna bilər. Çünki, onun poemaları monqol hücumları ərəfəsində Azərbaycan cəmiyyətinin üzləşdiyi dərin sosial-siyasi və iqtisadi böhrana güzgü tutur, hökm sürən mühitin xüsusiyyətlərini anlamaöa imkan verir.

Hesab edirəm ki, tarixçilərimiz bu mövzuya dair dərin araşdırmalar aparsalar xeyli maraqlı məlumatlarla rastlaşa bilərlər. Güman edirəm ki, gələcəkdə bu mövzuya dair də maraqlı araşdırmaların şahidi olacağıq.

**Sual:** Siz öz kitabınızda Nizaminin Allaha, dinə yanaşmada da elmi prinsiplərdən çıxış etdiyini deyirsiniz. Hətta siz bunu nümunəvi yanaşma kimi də təqdir edirsiniz. Sizcə nümunəvilik nədən ibarətdir?

**Cavab:** Bəli, elədir. Bilirsiniz ki, Nizami kainatın, insanın və ümumilikdə bütün canlı aləmin Allah tərəfindən

yaradıldığı fikrinə dərindən inanır. O belə hesab edir ki, təbiətin sirlərini qavramaqla, fəhm etməklə Uca Yaradanın qüdrətinin hüdudları haqqında aydın fikrə gəlmək mümkündür. Nizamiyə görə Allahı dərk etməyin ən qısa yolu onun yaratdığı ecazkar təbiətin sirlərini öyrənməkdən keçir. Məncə bu yanaşma bu gün də tətbiq edilməli və təbliğ olunmalıdır. Təbii ki, Allahı tam mənada qavramaq qeyri-mümkündür, lakin təbiətin sirləri, qanunları və s. bu mənada işləri xeyli asanlaşdırır. Nizaminin dinə yanaşmasını intellektual baxış kimi də qəbul etmək mümkündür. Hesab edirəm ki, Nizamidə elmlə din birləşib və bu baxışa müasir İslam ilahiyyatının böyük ehtiyacı var. Dini sıxıcı mühazirələr, yaxud pafoslu xütbələr vasitəsilə yox, intellektual yanaşma yolu ilə öyrənmək, dərk etmək ən uyğun həll yollu olardı. Nizami də məhz bu yolu təklif edir. Əgər biz Qurani-Kərimə nəzər salsaq, orada da Allahın insanları yerin göyün quruluşu, təbiətin nizamı haqqında düşünməyə dəvət etdiyini görərik. Yəni, Allahın dərki, onun qüdrətinin miqyası yaratdıqlarının nümunəsində daha asanlıqla dərk edilə bilər.

**Sual:** Necə düşünürsünüz, bu kitabla qarşıya qoyduğunuz vəzifəyə nail olmusunuz? Rus dilli oxuculara mütəfəkkir Nizamini yetərincə tanıda bilmisinizmi?

**Cavab:** Doğrusu, mənim öz kitabım haqqında hər hansı rəy söyləməyin doğru olmazdı, bunu oxucular və mütəxəssislər deyə bilərlər. Bircə onu deyə bilərəm ki, əgər akademik çevrələrinvə sıravi oxucların diqqətini bu mövzuya, onun əhəmiyyətinə cəlb edə bilmişsə, deməli məqsədimin müəyyən bir hissəsinə nail olmuşam.

**Sual:** Eldar müəllim, Siz Nizaminin təbiət və dəqiq elmlərlə bağlı zamanı qabaqlayan orijinal fikirlərinin tədqiqatçılar tərəfindən layiqli qiymətini almadığını deyirsiniz? Söhbət hansı fikirlərdən gedir, nümunə verə bilərsiniz?

**Cavab:** Əlbəttə, məsələn, Nizami "Xəmsə"də iki dəfə Saturn planetinin halqasından bəhs edir. Yaxud aləmlərin çoxluğu fikrini səsləndirir. Biz "Xəmsə" də güzgünün istehsal texnologiyasının təsvirilə rastlaşırıq. Yaxud, hər hansı cismin yalnız kənar təsir nəticəsində hərəkətə gələ biləcəyi fikri Nizami tərəfindən müxtəlif misallarla izah edilir. Bu qəbildən olan başqa nümunələr də var. Lakin nədənsə elm tarixinə dair qələmə alınan tədqiqat işlərinin əksəriyyətində Nizaminin fikirlərinin üzərindən sükutla keçilir. Bəli, mən qəbul edirəm ki, Nizami bu fikirlərini konkret elmi konsepsiya kimi meydana qoymur, lakin qədim Roma şairi Lukretsi Kar da "Əşyaların təbiəti" adlı əsərində münasibət bildirdiyi təbiət hadisələrini yalnız şəxsi mülahizə səviyyəsində təqdim edir. Lakin nədənsə onun poeması üzərində elm tarixçiləri ətraflı şəkildə dayanır, onun dəyərini xüsusi vurğulayırlar. Mən hesab edirəm ki, elm tarixçiləri Nizamiyə lazımi səviyyədə diqqət yetirmilər, ümidvaram ki, gələcəkdə bu laqeydlik aradan qalxacaq.

**Sual:** Sizcə Nizami belə haqsızlığa məruz qalmış yeganə Şərq mütəfəkkiridir?

**Cavab:** Təbii ki, yox, Şərqin elm dünyası üçün yaradıcılığı qaranlıq qalan onlarla dəyərli mütəfəkkirləri, təbibləri, riyaziyyatçıları, filosofları olub. Onların irsinin öyrənilməsi elm tarixi nöqteyi-nəzərindən bir çox maraqlı, mühüm məqamları üzə çıxara bilər. Məncə müsəlman Şərqinin, o cümlədən Azərbaycanın elm tarixi yeni mənbələr və peşəkar metodoloji yanaşma əsasında yenidən işlənməlidir. Bu elmə marağın təşviqi baxımından da olduqca zəruridir. Elm ən tutarlı və etibarlı istinad nöqtəsi, inkişaf yoludur. Elmi tədqiqatlar sahəsinin canlanması üçün bütün addımlar atılmalıdır. Cəmiyyətimiz elmin dəyərini anlamalı, onun inkişafına diqqət və həssaslıq əməli şəkildə artmalıdır. Mənim bu kitab vasitəsilə cəmiyyətə vermək istədiyim müsajlardan biri də məhz budur. Nizami şair kimi təbliğ etməklə yanaşı onu ali kimi təbliğ etmək də vacibdir. Hesab edirəm ki, Nizaminin elmi dəyəri tariximiz üçün onun ədəbi dəyərindən heç də az deyil. Bunu unutmaq lazım deyil.

Eldar müəllim, Sizə suallarımıza cavab verdiyiniz üçün bir daha minnətdarlığımızı bildirir, elmi axtarışlarınızda uğurla diləyirik. İnanırıq ki,

oxucularımızı yeni maraqlı tədqiqatlarla sevindirəcəksiniz.

**Eldar Əmirov:** Təşəkkür edirəm, mən də öz növbəmdə Sizin jurnalınıza geniş oxucu auditoriyası və maraqlı məqalələr, müsahibələr arzu edirəm. İnanıram ki, yaxın gələcəkdə jurnal ölkəmizin ən oxunaqlı, məzmunlu elmi nəşrləri sırasında öz layiqli yerini tutacaqdır.

**Müsahibəni hazırladı: *Şahin YƏHYAYEV*, "History of science" jurnalının Baş redaktorunun müavini**